Azerbaijan School, Volume 320, Issue 1, pp.35-48, 2013

**(*English*)**

# THE ROLE OF EDUCATION IN THE INFORMATION SOCIETY

**A.Hamzayev**

**Abstract**. In the article it is spoken about the importance of information-communication technologies in education and its role in the society.

---

**Keywords.** Information, communication, paradigm, technologies

(***Azerbaijan***)

# İNFORMASİYA CƏMİYYƏTİNDƏ TƏHSİLİN ROLU

**Əlihəsən Həmzəyev**

*Astara Pedaqoji Kollecinin direktoru, fəlsəfə elmləri üzrə fəlsəfə doktoru, dosent, əməkdar müəllim*

**Açar sözlər**. İnformasiya, kommunikasiya, paradiqma, texnologiya.

Azerbaijan School, Volume 320, Issue 1, pp.35-48, 2013

Hazırkı dövrdə cəmiyyətin başlıca istiqamətlərindən biri həyatımızın bütün sahələrinin kompyuterləşdirilməsidir. Bu aktual problem dünyanın inkişaf etmiş ölkələrinin inteqrasiyasında mühüm əhəmiyyət kəsb edir. BMT-nin bütün üzv ölkələrinin qlobal tərəfdaşlığının inkişafını şərtləndirən mühüm amil kimi informasiya-kommunikasiya texnologiyalarından (İKT) yüksək səviyyədə faydalanmaq nəzərdə tutulur. Məhz buna görə də, cəmiyyətin təhsillənməsinə, prosedural və kontekstual biliklərin qazanılmasına nail olmaq strateji hədəflərdəndir. Təsadüfi deyil ki, artıq Azərbaycanda neft sahəsinə alternativ olaraq İKT sektorunun inkişafına xüsusi diqqət ayrılmışdır.

2002-ci ilin fevralında Azərbaycan Respublikası ilə BMT İnkişaf Proqramı arasında imzalanmış proqram-layihə artıq real həllini tapmaqdadır. Açıq etiraf olunmalıdır ki, cəmiyyətimizdə informasiya emalının avtomatlaşdırılması probleminin həllindən sonra yaradıcı və insanların intellektual fəaliyyətinin məhsulu kimi informasiya ehtiyatları çoxalmaqdadır.

Müasir cəmiyyətdə informatika elmi ilə əlaqədar geniş maariflənməyə (təhsillənməyə) ehtiyac vardır. Son onilliklərin məhsulu olan informatika iki sözdən (informasiya və avtomatika) yaranmışdır. Fransızlar ilk dəfə (1960-cı il) avtomatlaşdırılmış informasiya emalı sahəsini adlandırmaq üçün bu sözdən (informatika) istifadə etmişlər. Elmi ədəbiyyatda informatika elmi informasiya emalı proseslərinin (informasiyanın toplanması, ötürülməsi, saxlanması, dəyişdirilməsi, ləğvi və s.) kompyuter texnikası vasitələri ilə avtomatlaşdırılmasından bəhs edən geniş bir sahədir.

İnformasiyanın ən mühüm xüsusiyyətlərinə onun faydalılığı, tamlığı, həqiqiliyi, qiymətliliyi, yeniliyi və s. aiddir. Son zamanlar "informasiya texnologiyaları" terminindən daha çox istifadə olunur. İnformasiya texnologiyaları aşağıdakıları özündə ehtiva edir:

- İnformasiya ehtiyatlarından istifadə olunması proseslərini asanlaşdırmaq, onların etibarlılığını artırmaq, çoxaltmaq;
- İnformasiyanı toplamaq;
- İnformasiyanı saxlamaq və ötürmək;
- İnformasiyanın emalı və istifadəçiyə çatdırmaq;
- İnformasiyanı vahid texnoloji zəncirdə birləşdirmək.

İnformatikanın bir elm kimi mühüm əhəmiyyəti dünya ölkələrinin təhsil sisteminin inteqrasiyasına nail olmaqla insanların elmi, praktiki biliklərinin inkişafına, yeni ixtiralarının qazanılmasına təminat verməkdir.

Bəşər sivilizasiyası tarixində informasiya emalı sahəsində bəşəri səciyyə daşıyan inqilablar olmuşdur. Onlara aşağıdakılar daxildir:

1. Yazının meydana gəlməsi;

2. Kitab çapı;

3. Elektrikin, teleqrafın, telefonun, radio-televiziyanın kəşfi;

4. Mikroprosessorların, fərdi kompyuterlərin, internetin meydana gəlməsi.

Qeyd olunanları ümumiləşdirsək, cəmiyyətin inkişafını kənd təsərrüfatı (aqrar), sənaye dövrlərindən keçərək informasiya mərhələsinə daxil olduğunu qəbul etmək olar.

Məlum həqiqətdir ki, qloballaşmanın genişlənməsi informasiya cəmiyyətində sosial-iqtisadiyyatın bütün sahələrində rəqabətin güclənməsi və təbii ehtiyatların azalması ilə müşayiət olunur. Qarşıya çıxan problemin həllində təhsil mühüm rol oynayır. Məhz buna görə də, BMT XXI əsri “Təhsil əsri” elan etmişdir. Bu cəhətdən ölkə başçısı Prezident İlham Əliyevin konseptual fikri bu sahədə dinamik inkişafın təmin olunmasında strateji əhəmiyyət kəsb edir. Biz maddi dəyərlərimizi, iqtisadi potensialımızı insan kapitalına çevirməliyik. Çünki insanın savadı, biliyi onun gələcək həyatını müəyyən edir, ölkənin hərtərəfli inkişafına xidmət edir və beləliklə, ölkənin intellektual potensialı da möhkəmlənir.

22 noyabr 2010-cu il tarixdə Bakıda “Təhsil və texnologiya vasitəsilə iqtisadi inkişaf” mövzusunda beynəlxalq konfransın keçirilməsi probleminin aktuallığına önəm vermişdir. Həmin konfransda Macarıstan, Norveç, Böyük Britaniya və digər ölkələrdən olan nümayəndələr qarşısında açılış zamanı təhsil naziri Misir Mərdanov demişdir: “Prezident İlham Əliyevin bilavasitə rəhbərliyi ilə Azərbaycanda təhsil sahəsində informasiya-kommunikasiya texnologiyalarının tətbiqi üzrə geniş tədbirlər həyata keçirilmişdir. Respublikada ümumtəhsil məktəblərinin informasiya və kommunikasiya texnologiyaları ilə təminatı (2005-2007-ci illər) çərçivəsində 3693 məktəbdə iş aparılmışdır. Bu müddətdə məktəblərə 30000-dən çox kompyuter verilmiş, 1722 təhsil ocağında kompyuter sinfi yaradılmışdır. Bakı, Sumqayıt və Gəncədə 7500-dən çox məktəb müəllimi treninqlərə cəlb olunmuşdur”.

Həyata keçirilən məqsədyönlü layihələrdən bir daha aydın olur ki, informasiya cəmiyyətinin sosial-iqtisadi əsasında maddi istehsal dayanmır. Burada ən önəmlisi informasiya və biliklərin istehsalı durur. Bu tələbin reallaşması cəmiyyətdə, ilk növbədə, təhsil sisteminin vəziyyətinin, rolunun və statusunun, bütövlükdə dəyişməsini zəruri edir. Açıq etiraf etməliyik ki, uzun illər, əsrlər boyu təhsil sanki insan fəaliyyətinin konservativ sahəsi kimi təzahür etmişdir. Sanki öyrən, yadda, hafizədə saxla prinsipi reallaşdırılmışdır. Buna baxmayaraq, biliklərin həcmi fasiləsiz olaraq artırdı. Mütənasib olaraq təhsilin ötürülmə səviyyəsi texnoloji cəhətdən aşağı göstəriciyə malik idi.

XX əsrin sonunda bəşəriyyətdə baş verən dəyişikliklər, müasir cəmiyyətin dinamikasında yaranan şərait biliklərin ötürülməsi, formasına və məzmununa öz təsirini göstərdi. Artıq əyani təhsil inkişafdan, demək olar ki, geri qalır. Dünya təhsil sisteminin düşdüyü bu problemin aradan qaldırılması yolları haqqında düşünən tədqiqatçılar (B.İ.Soldatkin, S.L.Lobaçev) müəyyən xarakterik amillərin nəzərə alınmasını vacib sayırlar.

- Bütün arzu edənlərə lazımi təhsil imkanının təmin olunmaması.
- Alınan biliklərin yeni texnologiyaların inkişafı səviyyəsindən geri qalması.

- Təhsil sisteminin müxtəlif sosial-iqtisadi şəraitlərə uyğunlaşmasının aşağı olması, konkret təhsil müəssisələrində alınan təhsilin spesifikliyi və s.

İnformasiyalaşmış cəmiyyətdə təhsilin rolu mövcud problemlərin həllindəki təsir imkanları ilə şərtlənir. Artıq böyük xərc tələb edən əyani təhsil yeni texnologiyalardan həyati bacarıqların qazanılmasında distant təhsildən keyfiyyət baxımından müqayisədə geri qalır. İnkişaf etmiş ölkələrdə DT (Distant təhsil) sistemi cəmiyyətin bütövlükdə inkişafına daha tez nüfuz edir, əlverişlidir və aşağıdakı cəhətlərlə xarakterizə olunur:

1. Təhsilalanın yaşayış yerinin təhsil yerindən uzaqlığı.

2. Yüksək olmayan həyat səviyyəsi.

3. Dayanıqlı olmayan iqtisadi səviyyə.

4. Təhsil xidmətlərinə olan tələbatın yüksək səviyyədə olması.

Hazırkı şəraitdə hər bir fərd daim öyrənməyə və özünü hazırlamağa səy göstərməlidir. Sürətlə genişlənən və yayılan informasiya qarşısında görüşlərimiz daim dəyişir. Buna görə də hər şeyi bilmək mühüm əhəmiyyət kəsb etmir. Zəruri informasiyaları necə əldə etməyin yolunu “öyrənməyi öyrətmək” başlıca vəzifədir. İnformasiya cəmiyyətində təhsilin başlıca sosial hədəfi bir çox amillərin diqqətdə saxlanmasını zəruri edir:

- təhsilin sosial səciyyəsi;
- DT (distant təhsil) imkanlarından faydalanmaq;
- təhsil həyati bacarıqlara əsaslanmalı;
- tələb-təklif arasında fərqin azaldılması.

Sosial informasiyanın məzmununu təşkil edən “maraq”, “aktivlik”, “tələbat” kimi amillər insanın idrak fəallığı ilə şərtlənir.

Tədqiqatın məqsədində Azərbaycan Respublikasının inkişafı naminə informasiya və kommunikasiya texnologiyaları üzrə milli strategiya (2003-2012-ci illər) konseptual səciyyə daşıyır.

Azərbaycan Respublikası Prezidentinin 2003-cü il 17 fevral tarixli müvafiq sərəncamı ilə təsdiq olunmuş həmin sənəddə informasiya cəmiyyətinin əsas xüsusiyyətləri aşağıdakı kimi müəyyən olunmuşdur:

- qlobal informasiya mühitinin yaradılması;
- informasiya və kommunikasiya texnologiyalarından kütləvi istifadə edilməsi, sosial və iqtisadi fəaliyyətin yeni formalarının yaranması;
- informasiyanın əmtəəyə çevrilməsi, informasiya və bilik bazarının yaradılması və inkişafı;

- təhsil sisteminin təkmilləşməsi, beynəlxalq, milli və regional səviyyədə informasiya mübadiləsi sistemlərinin imkanlarının genişlənməsi hesabına peşə və ümumi mədəniyyət səviyyəsinin artması;

- demokratik inkişafın vacib şərti sayılan vətəndaşların və sosial institutların məlumat almaq, onu yaymaq və istifadə etmək kimi hüquqlarını təmin edən mühitin yaradılması.

Qeyd olunduğu kimi, sənaye cəmiyyətindəki ənənəvi təhsil müasir inkişafı təmin etmir. Artıq informasiya cəmiyyətində innovatik təhsil, təhsilin fərdiləşməsi, fasiləsizliyi, zaman, məkan məhdudiyyətinin aradan qaldırılması qarşıda duran başlıca problemdir.

Cəmiyyətin inkişaf tarixində üçüncü qlobal sosial-texniki inqilab kimi müasir informasiya texnologiyaları ictimai həyatımızda reallaşır. Azərbaycanda informasiyalaşmış cəmiyyətin əsas xüsusiyyətlərinə qlobal informasiya mühitinin yaradılması, sosial iqtisadi fəaliyyətin yeni formalarının meydana gəlməsi (məsafədən təhsil alma, elektron ticarət, tele iş, elektron demokratiya, elektron hökumət və s.), informasiya və bilik bazarının yaradılması və s. aiddir.

Təhsilalanların cəmiyyətdə normal fəaliyyəti üçün müxtəlif tipli və xarakterli informasiya resurslarını əldə etməsinə və internetin xidmətlərindən geniş istifadə etməsinə təminat yaradılmalıdır. Bunun nəticəsində öyrənənin yüksək texnologiyalardan istifadənin səmərəliliyi, imkanları ilə bağlı keyfiyyətləri artır.

İnformasiya cəmiyyətinə daxil olan modernləşmə, ilk növbədə, zamanın tələblərinə cavabı keçmişdə deyil, gələcəyə hesablanmış, indiki dövrün başlıca təmayüllərinin dərk edilməsində axtarır. "İnformasiya cəmiyyəti" anlayışı 50 ildən artıqdır ki, dünyanın inkişaf etmiş ölkəsi olan yapon alimləri tərəfindən tədqiq edilərək sosial elmlərdə istifadə olunmaqdadır.

İnformasiya cəmiyyətinin əsas fəlsəfi mənası bütün insanların informasiya, bilik tələbatını ödəməkdən, onların arasında sosial kommunikasiya mühiti yaratmaqdan, təhsil və düşüncələrini, istədikləri məlumatı ictimaiyyətə çatdırmaqdan ibarətdir. Burada iki məqsəd paralel olaraq reallaşmalıdır:

Birincisi, informasiya bolluğunu yaratmaqla bəşəriyyətin qarşısında duran problemləri həll etmək;

İkincisi, cəmiyyətin ümumi inkişafını təmin etməkdir.

İnformasiya cəmiyyətinin formalaşmasında iştirakçıların böyük əksəriyyətinin müasir informasiya texnologiyalarından istifadə etmələri vacibdir. Belə olduqda bu prosesin əsasını təşkil edən biliyin istehsalı, saxlanması, emalı və ötürülməsi əməliyyatında kütləvilik genişlənmiş olur. Azərbaycanda informasiya cəmiyyətinin inkişafında təhsilin imkanlarını genişləndirmək məqsədi ilə bu sahədə dünyanın inkişaf etmiş ölkələrinin qazanmış olduqları texnologiyalarının mənimsənilməsi istiqamətində ölkədə sistemli islahat işləri aparılır.

Azerbaijan School, Volume 320, Issue 1, pp.35-48, 2013

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev demişdir: "Dünyada mövcud olan ən qabaqcıl texnologiyaları tətbiq etmək Təhsil Nazirliyinin gərək prioritet vəzifəsi olsun. Azərbaycanda gərək virtual dərslər, yeni texnologiyalar geniş yayılsın, bütün məktəbləri əhatə etsin. Bu, çox böyük, mürəkkəb, çoxlu maliyyə vəsaiti tələb edən proqramdır. Amma biz bunu etməliyik. Çünki biz gələcəyə baxmalıyıq".

İnformasiya cəmiyyətinin zəruri tələblərindən ən başlıcası təhsil sistemində İKT-nin tətbiqidir. İnformasiya təhsil mühiti formalaşdıqca iştirakçılarla (şagird-müəllim) İKT vasitələri arasında yeni səviyyəli biliklərin mübadiləsi imkanları gerçəkləşir. Bunun üçün müasir müəllim hazırlığının məzmun və forması informasiya texnologiyalarının sürətli inkişafı ilə uzlaşmalıdır. Yeni təhsil sistemi real praktikanı qabaqlamalıdır.

Təcrübə göstərir ki, təhsilin informasiyalaşması problemini həll edə bilməyən ölkələrin milli iqtisadiyyatı, əsasən də informasiya cəmiyyətinin tələb etdiyi innovasiyayönümlü, müasir tələblərə cavab verən kapitalın təminatında çətinliklərlə üzləşirlər. Milli təhsil sisteminin perspektivi məhz onun informatlaşma səviyyəsindən asılıdır.

"2013-cü ilin Azərbaycan Respublikasında "İnformasiya-kommunikasiya texnologiyaları ili" elan edilməsi haqqında" ölkə başçısının müvafiq sərəncamı informasiya cəmiyyəti quruculuğu istiqamətində yüksək kadr hazırlığının formalaşmasının təmin olunmasını reallaşdırmağa yönəlmiş Azərbaycan Respublikasında İnformasiya Texnologiyaları Universitetinin yaradılması bu sahədə tarixi hadisədir. Bununla əlaqədar olaraq, yeni təhsil paradiqmalarının tədqiqi aktuallaşmışdır. Azərbaycan dilinə "nümunə" kimi tərcümə olunan paradiqma yunan sözüdür. Amerika alimi T.Kup tərəfindən elmə gətirilən bu sözün mahiyyəti belə ifadə olunur: "Hamı tərəfindən qəbul olunmuş, elmi nailiyyətlərə əsaslanaraq, müəyyən zaman kəsiyində ictimaiyyət qarşısında duran əsas problemlərin və onların həlli ilə bağlı modellərin verilməsidir". Daha yığcam şəkildə araşdırma aparan insanların aldıqları nəticələrin praktik cəhətdən tətbiqi kimi başa düşülür.

Pedaqogikada paradiqmanın üç növü elmi cəhətdən sistemləşdirilmişdir:

1. Həqiqətin konkret elmi metodologiya ilə sınaqdan çıxarılmış, təcrübədə təsdiqini tapan elmi texnokratik paradiqma.

2. Hər fənn üzrə öyrənmənin tempi, təhsilalanların imkanları, informasiyanın qavranılması dinamikası nəzərə alınaraq humanist paradiqma həqiqətin dərk olunmasını özündə ehtiva edir.

3. Ezoterik paradiqmanın əsasını həqiqətin ədəbi və dəyişməz olduğu, ona çatmağın imkan və yolları təşkil edir.

Bu pedaqoji paradiqmalar insanın səmərəli fəaliyyətinin təbii mühitə təsir yükünün artırılması, milli-mənəvi və digər dəyərlərin rolunun artırılması üçün real imkanlar yaradır.

İndi cəmiyyətin hər bir üzvü informasiya texnologiyalarının iqtisadiyyatda tətbiqində zəruri bilik və bacarıqlara malik olmalıdır. Yəni material resursları material

informasiya texnologiyalarına və oradan da material məhsuluna transformasiyası ilə iqtisadi səmərə verməlidir. Material istehsalı texnologiya, neft, qaz, faydalı qazıntılardan və s. resurslardan alınır. Analoji olaraq, informasiya texnologiyası verilənlərin toplanması, ötürülməsi və emalı üçün üsul və vasitələrdən istifadə etməklə tədqiq olunan obyektin, prosesin, hadisənin vəziyyəti haqqında informasiya məhsulunun alınması prosesidir.

Müasir informasiya cəmiyyətinin inkişafı mövcud informasiya ehtiyatlarından istifadənin sürəti və operativliyindən, dəqiqliyindən və miqyaslılığından çox asılıdır. İnformasiyalaşmış cəmiyyətdə təhsilin rolunun artması insan fikir və fəaliyyətinin biosfer proseslərinə təsirini müəyyənləşdirən yeni mühit olan noosferanın yaranmasına gətirib çıxarır. Beləliklə, qeyd etmək istəyirik ki, müasir informasiya cəmiyyətinin inkişafının əsasını indi ənənəvi materiallar deyil, intellektual resurslar, biliklər, elm, təhsil, insanların bacarığı təşkil edir. Yaşadığımız cəmiyyətin mövcudluğu yalnız İKT mühitində qlobal internet şəbəkəsinin tətbiqi ilə mümkündür.

*Rəyçi: dos. Ə.İmanov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Mehrabov A. Azərbaycan təhsilinin müasir problemləri. Bakı: Mütərcim, 2007.

2. Azərbaycan Respublikasının təhsil sahəsində islahat proqramı. Bakı: Çaşıoğlu, 1999.

3. Mərdanov M. və b. Təhsil sistemində monitorinq və qiymətləndirmə. Bakı: Çaşıoğlu, 2003.

4. Kərimov S. İnformasiya sistemləri. Bakı: Elm, 2008.

5. Əliquliyev R. və b. İqtisadi proseslərdə informasiya texnologiyaları. Bakı, 2002.